*həssas olan quruluşu həyatını davam etdirə bilməyəcəkdi ...*

*Digər tərəfdən, suyun axıcılığı bir az daha az olsaydı, (zülallar, fermentlər kimi) makromolekulların və xüsusilə mitoxondri kimi xüsusiləşmiş quruluşlar ilə kiçik orqanoidlərin nizamlı hərəkətləri qeyri-mümkün hala gələcəkdi. Eyni şəkildə hüceyrə bölünməsi də imkansız olacaqdı. Hüceyrənin bütün həyati fəaliyyətləri donacaq və bizim bildiyimizə bənzər bir hüceyrə həyatı mümkün olmayacaqdı. Hüceyrələrin embriogenez (ana bətnindəki inkişaf) sırasındakı hərəkət etmə və sürünmə qabiliyyətlərinə bağlı olan daha yüksək orqanizmlərin inkişafı isə, suyun axıcılığının çox az aşağı olması vəziyyətində belə, qətiyyən baş tutmayacaqdı."* (Michael Denton, Nature's Destiny, s. 33)

Yer üzündə olan su, su dövranı sayəsində davamlı yenidən istifadəyə yararlı vəziyyətə gələrək insanları, bitkiləri və heyvanları qidalandırar. Ayrıca, yer üzündəki su Günəşin istiliyi sayəsində "təmizlənilmiş olaraq" buxarlanar. Buxar atmosferdə sıxlaşıb buluda çevrilər, sonra da yağış şəklində Yer səthinə təkrar geri qayıdar. Məsələn, bir ildə dünyanın ekvator bölgəsindən təxminən altı-yeddi yüz milyon ton suyun buxarlandığı və bunun şimal və cənub qütb bölgələrinin yaxınlarına daşındığı, sonra da yağış yolu ilə təmiz su olaraq yenidən dənizlərə töküldüyü hesablanmışdır.



**"De: "Bir söyləyin görək, əgər suyunuz çəkilib** *(yerin dibinə)* **getsə,** *(Allahdan başqa)* **kim sizə axar su gətirə bilər?!"** (Mulk surəsi, 30)

**"Bəs içdiyiniz suya nə deyirsiniz? Onu buluddan endirən sizsiniz, yoxsa Biz?!"** (Vaqiə surəsi, 68-69)

Bəhs etdiyimiz bu su dövranı baş verməsəydi, yəni su buxarlanıb yer üzünə qayıtmaq əvəzinə atmosferdə yox olsaydı, heç şübhəsiz bu vəziyyət həyatın sona çatması üçün yetərli bir səbəb olardı.

## İÇİNDƏKİLƏR:

